MÜƏLLİMİM - SƏRİYYƏ XANIM ƏSƏDOVA XATİRƏSİNƏ
HƏSR OLUNUR

***TELMAN İBRAHİMOV***
Azərbaycan Milli Elmlər Akademiyası

# ZƏRGƏRLİK SƏNƏTİNDƏ "GAVƏRSƏ" MOTİVİNİN MƏNŞƏYİ, SİMVOLİZMİ VƏ ETİMOLOJİSİ



Gavərsə - ənənəvi Azərbaycan zərgərlik sənəti leksikonunda gümüş və ya - qızıldan hazırlanmış xırda ölçülü kürəciklərə deyilir. Ölçüləri 0,4mm. - dən başlayan parıltılı gümüş/qızıl kürəciklər zərğərlik əşyasının bəzəyində xüsusi işıq-kölgə "oyunu" yaradaraq, əşyanın plastik zənginliyini, bədii və emosional təsir gücünü artırır. Gavərsə, bəzək motivi kimi, əsasən ənənəvi "şəbəkəçilik" sənətində tətbiq olunaraq, sivri, spiralvari, gül, çiçək, , gönçə, yarpaq və digər şəbəkə motivlərinin plastik aksenti, parıltılı işıq mənbəyi rolunu oynayır.

Şəbəkəçilik sənətinin inkişafı və yeni dekorativ motivlərin axtarışı və tətbiqi nəticəsində gavərsələrin əşyanın dekor ansamblında istifadəsi də genişlənir. Artıq, gavərsə motivləri xırda bəzək aksenti rolu ilə kifayətlənməyərək, ozləri müstəqil dekor motivinə çevrilirlər. Ənənəvi üsulla hazırlanan gavərsələrlə bərabər - "çaxma gavərsə" və "tökmə gavərsə" növləri də yaranır. Çaxma gavərsələr daha iri ölçülü olaraq, basma-qəlib(stamp) vasitəsilə ilə hazırlanaraq, iki yarımkürəciyin lehimlənməsi ilə hazırlanıblar. "Tökmə gavərsələr" isə - qəlib vasitəsilə yaradılmış gavərsələr olur.

Gavərsələrin tək və ya qrup şəkilində(üç ədəd) tətbiq edilməsi bəzək əşyasının hamar və boş hissələrinə də yol açaraq, müstəqil motiv rolunu oynamağa başlayırlar. Bu üsulu biz məşhur şəbəkəli "Ay-sırğaların" bəzək sistemində aydın görə bilirik. İncə borucuq profilli sırqaların dairəvi gövdəsinə(bəndəm) alt tərəfdən sıra ilə lehimlənən gavərsələrin sayı 20 x 2 = 40 olduqda, xalq arasında "qırx-düymə" adlandırılmışlar. Gavərsə-düymələrin sayından asılı olaraq, bu sırğaların "üç-düymə", "beş-düymə" və s. adlanan variantları da var. Sırğanın qədimdən gələn ənənəvi forması və məzmununa əsasən – "Ay-sırğa" adlandırılması daha düzgündür.

Əslində, “qırx-düymə” kimi tanınan şəbəkəli sırğanın səmadakı Hilal formasını təqlid etməsi aydın görünür. Sırğalarda “Ay” motivinin ən erkən nümunələri ilə biz Alban dövrünün qızıl sırğalarında rast gəlirik. Bildiyimiz kimi, qədim Albaniyada səma cisimləri olan Ay, Günəş, Ulduz - sitayiş obyektləri olmuşlar. Tarixçi Strabonun məlumatına görə Ay tanrısı – qədim Albanların baş tanrısı olmuşdur. Albaniya dövrünə aid Hilal formalı qızıl sırğalar Mingəçevir, İsmayıllı və Şamaxı ərazilərində aparılmış arxeoloji qazıntılar zamanı tapılmışlar. Heç şübhə yoxdur ki, yüzillər sonra yenidən yaranan və xalq arasında “qırx düymə”adı ilə məşhurlaşan sırğa motivinin mənşəyini məhz Alban dövrünün zərgərlik sənətində axtarmaq lazımdır.

Qədim Albanların etnik tərkibində Skit və Hun tayfalarının da olması məlumdur. Türk mənşəli Alban tayfalarının dini-ideoloji etiqadlarında “Ay” tanrısına sitayişin kökləri son tunc-erkən dəmir dövründən izlənilir. Aypara şəklində olan mərasim təyinatlı tunc təbərzin baltaları, aypara formalı asma bəzəklər – qədim Azərbaycanda Ay simvolunun sakral statusunun çox qədim zamanlardan təsbit olunmasına işarə edirlər.

Alban dövrünün zərgərlik sənətində Hilal simvollu bəzək əşyalarında xırda parlaq metal kürəciklər vasitəsilə əsas motivi bəzəmək ənənəsi yaranır. Simvolik mənada parıltılı işıq saçan xırda kürəciklər - müqəddəs “Ay”ın ilahi nurunu simvolizə etmişlər. Ay tanrısının ətrafa bəxş etdiyi “İlahi Nur” – bolluq, xeyir-bərəkət, məhsuldarlığın tanrı tərəfindən mistik emmanasiyası kimi qavranılırdı. Aypara və onu müşaiət edən gavərsələrin bədii funksiyası isə, güclü işıq parıltısı effekti vasitəsilə - bolluq, zənginlik obrazının yaradılmasında idi.

Gavərsələrin zərgərlik əşyalarında dekorativ və simvolik motivi kimi tətbiqi yalnız antik Albaniyada deyil - Cənubi Azərbaycanda, Atropatena dövrü zərgərliyində də müşahidə olunur.

Orta əsrlər Azərbaycan zərgərliyində qədim Alban və Atropatena dövrünün zərgəlik ənənələrinin dirçəlməsi ilə - qədim gavərsə motivinin yeni, “Ay-sırğa”larda tətbiqi yenidən vüsət alır. Lakin, yeni, İslam kontekstli dizaynda qədim Hilal simvolizmi yeni, daha dolğun və özünəməxsus şəkildə nəzərə çarpır. Belə ki, yeni “Ay-sırğa”nın formasında biz Ayın iki fərqli görüntüsünü vahid kompozisiyada görə bilirik: aypara şəklində olan – “Hilal” formasını və “Bədirlənmiş Ay” formasını. Aypara formalı Hilalın - sırqanın dairəvi halqası(bəndəm) daxilində yerləşdirməklə, “Ay motivi”nin simvolizmi daha dolğun məzmun əldə etmiş oldu.

XIX-XX ə.ə. yaradılmış “Ay-sırğalarda” qədim bütpərəst məzmunlu gavərsə motivlərini hələ də görmək mümkündür. Lakin, Alban dövründən fərqli olaraq, yeni “Ay-sırğalarda” vaxtilə müqəddəs olmuş Hilalın “ilahi Nur”

mənbəyi olması ideyası artıq itirilmişdir. Bu sırğalarda gavərsələr bütpərəst məzmundan azad olaraq, sırf bəzək mahiyyətli elementlərə çevrilmişlər.

Azərbaycan zərgərlik sənətinin tarixi ilə məşğul olan tədqiqatçılar "gavərsə" terminin mənşəyi, məzmunu və etimologiyasına niyəsə lazımi diqqət yetirməmişlər. Nəticə etibarilə, gavərsə termini ilə bir-başa əlaqəsi olan və öz adı ilə izah olunan semantik və simvolik məzmun təfərruatları diqqətdən kənarda qalmışlar. Halbuki, motivin mənşə informasiyası bir-başa özünün adında konservasiya olmuşdur.

Gavərsə terminin etimoloji və semantoloji təhlili müəyyən etməyə imkan verdi ki, ənənəvi zərgərlik sənətimizdə bəzək motivi kimi tətbiq olunan "gavərsənin" vizual forması ilə - adının məzmunu arasında məna-məzmun vəhdəti mövcuddur.

Gavər - Azərbaycanda bitən çətirlilər sinfinə aid kol bitkisinin (*Commiphora guidotti*) adıdır. Gavər çiçəyinin xırda, kürəvari tumcuqları çətirvari şəkildə çiçək yatağına birləşmiş olurlar. Bu xırda kürəvari tumlar gavərin meyvələri - gavərsələridir.

Gavər bitkisinin və digər ağac və kol budağlarının qabığından damcı-damcı süzülən şirə - tədricən quruyub bərkiyərək, qətran xassəli kürəciklər şəklinə düşür. Bu xırda qətran kürəcikləri gavər çiçəyinin xırda tumlarına bənzədiyindən - gavərsə adlandırılmışlar.

Ənənəvi zərgərlik sənətimizin bəzək motivi olan gavərsələrin hazırlanması nəticəsində metal qırıntıları əriyərək - xırda, parlaq kürəciklər halına düşürlər. Gavər bitkisinin xırda kürəvari tumlarını və qabığından süzülərək damcıvari forma alan qətran dənəciklərini xatırladan gavərsələrin texnoloji element kimi yaranmasında, bəzək motivi kimi tətbiqində və terminoloji adlandırılmasında bu oxşarlığın təsiri həlledici olmuşdur.

## ƏDƏBİYYAT


1. Əsədova S.D. XIX-XX əsrlərdə Azərbaycan zərgərlik incəsənəti. Bakı. "Elm", 1978
2. İbrahimov F.Ə. Azərbaycanın orta əsr şəhərlərində metalişləmə sənəti. Bakı,"Elm" 1988
3. İbrahimov F.Ə. Bakıda metalişləmə tarixi. Bakı, "Elm" 1995
4. Эфенди Р.С. Ювелирное искусство Азербайджана. Баку, 1964
5. Bəşirov R. Naxçıvanın orta əsrlər metalişləmə sənəti (IX-XVII əsrlər), Bakı 2015
6. Рзаев Н.И. искусство кавказской Албании. IVв. до н.э.-VIIв. н.э.
7. Засецкая И.П. Золотые украшения гуннской эпохи. Ленинград, «Аврора», 1975
8. Алиев К. Г. Античная Кавказская Албания. Баку, «Азернешр», 1992
9. Алиев К.Г. Античные источники по истории Азербайджана. Баку, «Элм», 1986
10. Fazili A. H. Atropatena. er.əv. IV-eramızın VII əsri. Bakı, "Elm" 1992
11. Новиков В.П., Павлов В.С. Ручное изготовление ювелирных украшений. Ленинград, «Политехника», 1991



“Ay-sırğa”(“Qırx düymə sırğa”). Şəbəkəçilik və Minasazlıq üsulu



“Aynalı” şəbəkəli kəmərlər



“Ay-sırğalar”. Alban dövrü. A- Şamaxı(Dəmirçilər); B- İsmayıllı(Çərmədil)



A - Tunc qolbağ. Antik Albaniya ;
B – Qızıl gavərsəli sırğa. Antik Albaniya.Mingəçevir




A – Qızıl sırğalar. Antik Albaniya. Mingəçevir;  B – Gavərsəli Hun asma bəzəyi




A – Antik Albaniya. Qəbələ. Qızıl parfüm konteyneri;
B – Asma bəzək. Qızıl. Atropatena
C -  Antik Albaniya. Ağsu. Qızıl “Ay-sırğa”

A








A – Skit dövrü(e.ə. 4 ə.). Saçlara bənd olunan asma bəzək. Qızıl. Gavərsəli Ayparalar
B - Hunlara aid “Aypara” Gicgah asmaları. Qızıl. Aktastı(Qazaxstan)




Gavər çiçəyi.  (latın: *Commiphora guidotti )*





Oppopanax - qətran xassəli gavərsələr




Səriyyə Davud qızı Əsədova. XIX-XX əsrlərdə Azərbaycan zərgərlik incəsənəti

Bakı, “Elm” nəşriyyatı, 1978